**UOT:334. 021.**

# REGİONAL İQTİSADİ İNKİŞAFDA YEYİNTİ SƏNAYESİNİN İNKİŞAF İSTİQAMƏTLƏRİ

**P. H. MƏMMƏDOV, V. A. MURADOV**
**Bakı Mühəndislik Universiteti**

*Yeyinti sənayesi ölkədə ərzaq ehtiyatının yaradılmasında mühüm rol oynayır. Azərbaycanda kənd təsərrüfatı yeyinti sənayesi ilə qarşılıqlı şəkildə regionların iqtisadi inkişafında iştirak edir. Kənd təsərrüfatı və yeyintisənayesi arasında əlaqə mexanizmlərinin təkmilləşdirilməsi, yeni texnologiyaların tətbiqi, qida sənayesi müəssisələrinin yenidən qurulması və modernləşdirilməsiəhalinin şəxsi istehlak səviyyəsiniyüksəldir və ərzaq məhsullarına olan tələbatını təmin edir.*

***Açar sözlər:****regionlar, iqtisadi inkişaf, kənd təsərrüfatı, yeyinti sənayesi, emal müəssisələri, ərzaq fondu.*

Yeyinti sənayesinin kompleksinkişafına yönəldilmiş regional siyasət sənaye ilə kənd təsərrüfatı arasında dövlət tənzimlənməsini təmin edir. “Regional inkişaf siyasəti dövlətin sosial-iqtisadi inkişaf siyasətinin mühüm tərkib hissəsi olduğundan, onun reallaşdırılması mexanizmi də bütövlükdə, ölkənin sosial-iqtisadi inkişaf siyasəti mexanizminin tərkib hissəsisdir. ”[2, s. 291]

Sosial-iqtisadi inkişaf siyasətinin mühüm tərkib hissəsi sayılan regional iqtisadi siyasətin çevikliyi iqtisadiyyatın aparıcı sahələrinin əlaqələndirilməsində mühüm rol oynayır. Prioritet sahələrin düzgün seçilməsi vəinkişaf istiqamətlərinin düzgün müəyyən edilməsi regional siyasətin müvəffəqiyyəti üçün çox mühüm məsələlərdən biridir. Azərbaycan Respublikasının Prezidentinin 2004-cü il 11 fevral tarixli 24 nömrəli Fərmanı ilə təsdiq edilmiş “Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramının (2004-2008-ci illər)” əsas məqsədi qeyri-neft sektorunun davamlı inkişafı, ölkə regionlarının tarazlı inkişafının təmin edilməsi, regionlarda kommunal xidmət və sosial infrastruktur təminatının yaxşılaşdırılması, yeni iş yerlərinin və müəssisələrin yaradılması nəticəsində əhalinin məşğulluqsəviyyəsinin artırılması və həyat səviyyəsinin yüksəldilməsindən ibarət olmuşdur. “Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı(2004-2008-ci illər)”nın uğurlu icrası nəticəsində 2004-2008-ci illərdə “Ölkə iqtisadiyyatının inkişafına bütün maliyyə mənbələri hesabına əsas kapitala qoyulmuş investisiyanın həcmi beş ildə 33, 5 milyard manat təşkil etmiş, bunun 53, 2 faizi daxili, 46, 8 faizi isə xarici investisiyalar olmuşdur. Bu dövr ərzində regionlara yönəldilmiş dövlət investisiyalarının ümumi məbləği 6, 8 milyard manata yaxın olmuşdur. Qeyri-neft sektoruna qoyulan investisiyanın həcmi beş ildə 6, 2 dəfə artmış və ümumi investisiyaların strukturunda onun xüsusi çəkisi 2003-cü ildəki 26, 8 faizdən 2008-ci ildə 69 faizə çatmışdır. 2004-2008-ci illərdə dövlət investisiyalarının həcminin artması regionlarda infrastruktur, kommunal, sosial xidmət obyektlərinin tikintisinin bir neçə dəfə artmasına və xidmət sektorunda keyfiyyətin yüksəlməsinə təkan vermişdir. . ” [7]

2004-cü ildənbaşlanmış tədbirlərin davam etdirilməsi üçün Azərbaycan RespublikasınınPrezidentinin 2009-cu il 14 aprel tarixli Fərmanı ilə “Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı DövlətProqramı” təsdiq edilmişdir. “Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadiinkişafı Dövlət Proqramı”nın uğurlu icrası nəticəsində ölkədə makroiqtisadigöstəricilərin səviyyəsində yüksək artım əldə edilmiş, sosial-iqtisadi inkişaf sahəsindənəzərdə tutulmuş tədbirlərin həyata keçirilməsi əhalinin həyat səviyyəsinin daha dayüksəlməsində mühüm rol oynamışdır.

Regional inkişaf üzrə hər iki dövlət proqramlarının icrasıölkənin makroiqtisadi göstəricilərinin sürətlə yaxşılaşmasınasəbəb olmuş, “Ümumi Daxili Məhsul (ÜDM) 3, 2 dəfə, adambaşına ÜDM-in həcmi 2, 8dəfə, qeyri-neft sektoru 2, 6 dəfə artmış və ölkəmizdə orta illik iqtisadi artım 12, 9 %təşkil etmişdir. . . 2004-2013-cü illərdə daxili investisiyalar 14, 6 dəfə, qeyri-neftsektoruna investisiyalar 12, 9 dəfə artmış, regionlara bütün mənbələr hesabına 50, 7milyard manat vəsait yönəldilmişdir. . . Kənd təsərrüfatının ümumi məhsulu son 10 ildə 1, 5 dəfə, taxıl istehsalı 43, 9 faiz, kartof istehsalı 29, 1 faiz, tərəvəz 17, 8 faiz, bostan məhsulları 20, 5 faiz, meyvə və giləmeyvə 49, 1 faiz, üzüm istehsalı isə 2, 4 dəfə artmışdır. ” [8]

Regional iqtisadi inkişafa kömək məqsədilə qəbul olunan növbəti İnkişaf Proqramı-“Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafıDövlət Proqramı”nın əsas məqsədi isə ölkədə qeyri-neft sektorunun inkişafı, iqtisadiyyatındiversifikasiyası, regionların sürətli inkişafı istiqamətində tədbirlərin davam etdirilməsi,

xüsusi ilə kəndlərin inkişafı ilə bağlı infrastrukturun və sosial xidmətlərin daha dayaxşılaşdırılmasından ibarətdir.

"2014-cü ildə qida, tütünməhsullarının və içkinin istehsalı 2, 7 milyard manata çatmış, müqayisə üçün həminsiyahıda ikinci yerdə duran neft məhsulları istehsalı sahəsində 2, 6 milyard manathəcmində məhsul istehsal olmuşdur. Onu da qeyd etmək olar ki, aqrar sənayesinin məhsullarının həcmi son 10 ildə orta hesabla 2, 7 dəfə artmışdır. . . 2014-cü ildə ölkənin aqrar bölməsi üzrə 5 milyard 226 milyon manat məhsulistehsal olunmuşdur ki, bu da əvvəlki illə müqayisədə 2, 6 faiz çoxdur" [1, s. 6]

Regionların iqtisadi inkişafına dair qəbul olunmuş dövlət strategiyaları, o cümlədən "Yeyinti məhsulları haqqında" (1999), "Taxıl haqqında" (2000), "Tütün və tütün məmulatı haqqında" (2001), "Üzümçülük və şərabçılıq haqqında" (2010) kimi Azərbaycan Respublikasının qanunları bu sənaye sahəsinin inkişafına təkan vermişdir.

Kənd təsərrüfatı və yeyinti sənayesinin inkişafı strategiyasının uğurla həyata keçirilməsi üçün işlənib hazırlanan"Azərbaycan Respublikasında tütünçülüyün inkişafına dair 2017-2021-ci illər üçün dövlət Proqramı", 2012-2020-ci illərdə Azərbaycan Respublikasında üzümçülüyün inkişafına dair Dövlət Proqramı", "Azərbaycan Respublikasında kənd təsərrüfatı kooperasiyasının inkişafına dair 2017-2022-ci illər üçün Dövlət Proqramı", kimi sənədlərin rolu çox böyükdür.

Azərbaycan Respublikasında texniki bitkiçilik (pambıqçılıq, üzümçülük, çayçılıq, tütünçülük, şəkər çuğunduru); meyvəçilik (o, cümlədən məhsuldar meyvə bağlarının salınması üçün tingçilik təsərrüfatlarının inkişafı), tərəvəzçilik və bostançılıq, heyvandarlıq, cins maldarlıq (damazlıq təsərrüfatlarının yaradılması və yaxud inkişaf etdirilməsi), sənaye quşçuluğu (broyler təsərrüfatlarının inkişafı) dənli bitkiçilik (taxılçılıq), baramaçılıq, balıqçılıq, arıçılıq kimi kənd təsərrüfatı üzrə nəzərdə tutulan inkişaf istiqamətlərinə çoxlu sayda maliyyə vəsaitlər sərf olunur, o cümlədən müasir texnologiyalar tətbiq edilir.

Azərbaycanın kənd təsərrüfatı sahələrinin tarixi kökləri çox qədim dövrlərə gedib çıxır. Dünyanın 11 iqlim tipindən 9-nun Azərbaycanda mövcud olması onun bu və ya digər zonalarında ilin bütün fəsillərində bol kənd təsərrüfatı məhsulları yetişdirməyə şərait yaradır və beləliklə də əhalini il boyu bu məhsullarla təmin etməyə imkan verir.

"Azərbaycan üzüm bitkisinin ən qədim yaranma və formalaşma mərkəzlərindən biri olub, qədim üzümçülük və şərabçılıq diyarıdır. İndiki Azərbaycan ərazisində üzümün becərilməsinin qədimliyini çoxsaylı ədəbiyyat məlumatları, eləcə də arxeoloji qazıntılar zamanı tapılmış zəngin qədim əşyalar, maddi mədəniyyət abidələri, üzüm bitkisinin müxtəlif orqanlarının, üzüm və şərabçılıq məhsullarının qalıqları sübut edir. " [4, s. 19] Üzümçülüyün inkişafı şərabçılıq sənayesində köklü dəyişikliklər baş vermiş, yeni şərabçılıq regionları formalaşmışdır. "Araşdırmalar Azərbaycanda üzümçülük və şərabçılığın tarixinin 5-7 min il bundan əvvələ gedib çıxdığını göstərir. Antik və erkən orta əsrlərə aid (Qaraçıbulaq, Meynətəpə, Şəkili və s. ) abidələr bu dövrdə üzümçülük və şərabçılığın inkişaf etdiyindən xəbər verir. " [3, s, 7. ]

Azərbaycanda Eneolit dövrü təxminən e. ə. VI-IV minillikləri əhatə edir. Bu dövrdə ilk dəfə olaraq misdən istifadə edilsə də, əkinçilikdə yenə də daş alətlər əsas mövqeyə malik olmuşlar. Əkinçilik və heyvandarlıq aparıcı sahə olmaqla yerli əhalinin başlıca məşğuliyyəti sayılmış və onun iqtisadi həyatının əsasını təşkil etmişdir. Bu dövrdə taxılın əkilib-becərilməsi, döyülüb yığılmasında ağac, daş və qismən də sümük alətlərdən istifadə edilmişdir. Azərbaycanın dağ və dağətəyi ərazisində dəmyə əkinçiliyin təşəkkül tapması və inkişafı üçün hər cür münasib coğrafi şərait olmuşdur.

Azərbaycanda ölkənin kənd təsərrüfatı sahəsində əhəmiyyətli yerə malik olmuş aqrar sahələrdən biri də tütünçülükdür. Azərbaycanda XVII-XVIII əsrlərdən əkilməsi ehtimal olunur. XIX əsrin 40-cı illərindən isə təsərrüfat sahəsinə çevrilmiş, iqtisadiyyatımızda müəyyən yer tutmuşdur. XIX əsrin 70-ci illərindən Azərbaycanda tütün əkini sürətlə genişlənməyə başladı. "1883-cü ildə Azərbaycanda təqribən 144 desyatin sahəni əhatə edən 554 tütün plantasiyası var idi. Buradan 15707 pud (1 pud=16 kq) məhsul toplanmışdı. Ölkədə istehsal olunan tütünün miqdarı durmadan artırdı, 1883-cü ildən 1893-cü ilədək dövrdə təkcə Bakı quberniyasında 10 il ərzində tütün əkilən sahə 3 dəfə artmışdı. Bu irəliləyiş sonrakı illərdə də davam edirdi. 1900-cü ildə Azərbaycanda 239 desyatin sahədə 22297 pud məhsul əldə edilmişdisə, 1903-cü ildə 485 desyatin sahədə 42411 pud olmuşdu. 1913-cü ildə isə ümumi sahəsi 155 desyatin olan 928 tütün plantasiyası var idi. Bu dövrdə Azərbaycan bütün Zaqafqaziyada istehsal olunan tütünün 30 faizindən çoxunu verirdi. "[6]Respublikada tütünçülüyün elmi əsaslarla inkişafı və bu sahə üzrə yüksək sənaye potensialının yaradılması XX əsrin 70-ci illərinin başlanğıcına təsadüf edir. Hal-hazırda Azərbaycanın 13 rayonunda tütünçülük genişləndirilir.

Qeyd etmək lazımdır ki, xammal istehsalı və yeyinti məhsulları üzrə kənd təsərrüfatı sahələri respublikanın regionalrında aşağıdakı kimi qruplaşdırılır:

1. Abşeron iqtisadi rayonu. Bakı, Sumqayıt şəhərləri, Abşeron və Xızı inzibati rayonlarının daxil olduğu bu rayonda kənd təsərrüfatının əsasını südlük-ətlik maldarlıq, quşçuluq, qoyunçuluq, tərəvəzçilik, bostançılıq, üzümçülük və quru-subtropik meyvəçilik təşkil edir.

2. Aran iqtisadi rayonu. İqtisadi rayonun tərkibinə Kür-Araz ovalığında yerləşən inzibati rayonlar daxildir. Onlara Ağdaş, Ağcabədi, Beyləqan, Biləsuvar, Bərdə, Zərdab, İmişli, Yevlax, Kürdəmir, Göyçay, Neftçala, Saatlı, Sabirabad, Salyan, Ucar və Hacıqabul rayonları aiddir. Respublika tabeliyində olan Mingəçevir, Şirvan və Yevlax şəhərləri də burada yerləşir. Burada olan bol günəş işığı, qızmar keçən yay istisevən bitkilərin (pambıq, üzüm, taxıl), dadlı və qidalı bostan-tərəvəz məhsullarının, quru subtropik meyvələrin (heyva, nar və digər çəyirdəkli meyvələr) yetişdirilməsinə imkan verir. Düzənliklərdə qış mülayim və yağıntılı keçdiyinə görə payızlıq dənli bitkilər əkilir.

3. Yuxarı Qarabağ iqtisadi rayonu. İqtisadi rayonun tərkibinə Ağdam, Tərtər, Xocalı, Xocavənd, Füzuli, Cəbrayıl, Şuşa inzibati rayonları daxildir. Burada həmçinin respublika tabeli Xankəndi və Şuşa şəhərləri yerləşir. Yuxarı Qarabağda üzümçülük, taxılçılıq, tütünçülük, pambıqçılıq və heyvandarlıq kənd təsərrüfatının əsas sahələridir. Regionda həmçinin meyvə, kartof, bostan-tərəvəz məhsulları becərilir. Şərabçılıq, konserv məhsullarının istehsalı, digər kənd təsərrüfatı məhsullarının emalı yeyinti sənayesinin əsas sahələridir.

4. Kəlbəcər-Laçın iqtisadi rayonu. İqtisadi rayonun tərkibinə Kəlbəcər, Laçın, Zəngilan və Qubadlı inzibati rayonları aid edilir. Yüksək dağlıq sahələrdə olan subalp və atp çəmənliklərinin yay otlaq sahələri və biçənəklər kimi əhəmiyyəti böyükdür. Çəmənliklər arıçılıq üçün də əlverişli ərazilərdir.

Kəlbəcər-Laçın vaxtilə respublikanın heyvandarlıq zonalarından biri olmuşdur. Tütünçülük, üzümçülük, meyvəçilik, taxılçılıq burada bitkiçiliyin mühüm sahələridir. Sənaye nıüəssisələri bu xammal növlərinin emalına əsaslanmışdır. İqtisadi rayonda ət-süd məhsulları emal edilir, xalça toxunurdu.

5. Dağlıq Şirvan İqtisadi rayonu. İqtisadi rayonun ərazisinə Şamaxı, İsmayıllı, Ağsu və Qobustan inzibati rayonları aiddir. İqtisadi rayonun təsərrüfatı əsasən kənd təsərrüfatından ibarətdir. Dəmyə əkinçiliyi üstünlük təşkil edir. Üzümçülük, taxılçılıq və heyvandarlıq inkişaf etmişdir.

6. Quba-Xaçmaz iqtisadi rayonu. İqtisadi rayonun ərazisi Quba, Qusar, Şabran, Siyəzən və Xaçmaz inzibati rayonlarından təşkil olunmuşdur. Kənd təsərrüfatı iqtisadi rayonun təsərrüfatının əsasıdır. Tərəvəzçilik və meyvəçilik onun əsas ixtisaslaşma sahələridir. Tərəvəz yığımına görə Xaçmaz və Qusar rayonları, meyvə yığımına görə Quba, Qusar və Xaçmaz rayonları fərqlənir. Bunlardan başqa Xaçmaz, Siyəzən yə Şabran rayonlarında üzüm, Qusarda kartof yetişdirilir. İqtisadi rayonun əhali məskunlaşan hər yerində taxıl əkilir.

Düzən ərazilər südlük-ətlik maldarlığın, dağlıq rayonlar qoyunçuluğun əsas mərkəzləridir. Yay və qış otlaqlarının növbələşməsi burada qoyunçuluğun inkişafı üçün əlverişli şərait yaradır. Siyəzən, Çarxı və Dəvəçidə quşçuluq kompleksləri vardır.

7. Gəncə-Qazax iqtisadi rayonu. İqtisadi rayonun ərazisinə Qazax, Ağstafa, Daşkəsən, Gədəbəy, Goranboy, Samux, Göygöl, Tovuz və Şəmkir inzibati rayonları daxildir. İqtisadi rayonda kənd təsərrüfatı da inkişaf etmişdir. Üzümçülük, kartofçuluq, taxılçılıq iqtisadi rayonun kənd təsərrüfatının əsas ixtisaslaşma sahələridir. Üzüm yığımına görə Qazax, Ağstafa, Şəmkir və Samux rayonları, kartof yığımına görə Gədəbəy, Şəmkir və Tovuz rayonları fərqlənir. Taxıl yığımına görə Goranboy və Şəmkir rayonları irəlidə durur. Burada həmçinin pambıqçılıq (Goranboyda), bostançılıq, tərəvəzçilik, meyvəçilik və heyvandarlıq sahələri inkişaf etmişdir. Ceyrançöl respublikanın mühüm qış otlaq sahələrindən biridir.

8. Şəki-Zaqatala iqtisadi rayonu. İqtisadi rayona Balakən, Qax, Qəbələ, Zaqatala, Oğuz, Şəki inzibati rayonları və respublika tabeli Şəki şəhəri daxildir. Bu ərazilərdə becərilən tütün, qərzəkli meyvələr, taxıl, bəslənən barama iqtisadi rayonun kənd təsərrüfatının əsas sahələridir. Tütün yığımına görə Şəki və Zaqatala rayonları, meyvə yığımına görə Şəki, Oğuz, Balakən, Zaqatala, Qax rayonları irəlidə durur. Şəki, Zaqatala, Qəbələ rayonlarında daha çox taxıl yığılır. Şəki-Zaqatalada yerləşən sənaye müəssisələri əsasən kənd təsərrüfatı məhsullarını emal edir.

9. Lənkəran iqtisadi rayonu. İqtisadi rayon Astara, Yardımlı, Lerik, Lənkəran, Masallı, Cəlilabad inzibati rayonlarından və respublika tabeliyində olan Lənkəran şəhərindən ibarətdir. İqtisadi rayonun sənaye nıüəssisələri becərilən kənd təsərrüfatı məhsullarının və Xəzər dənizindən tutulan balıqların emalına əsaslanır. Faraş tərəvəzçilik, rütubətli subtropik (sitrus) meyvəçilik və çayçılıq Lənkəran-Astara iqtisadi rayonunda kənd təsərrüfatının ixtisaslaşmış sahələridir. Burada həmçinin tütün, çəltik, taxıl, üzüm becərilir.

10. Naxçıvan iqtisadi rayonu. İqtisadi rayon eyni adlı Muxtar Respublikanı əhatə edir. Burada Babək, Ordubad, Sədərək, Şahbuz, Kəngərli, Culfa və Şərur inzibati rayonlara ayrılır. Naxçıvan MR-də kənd təsərrüfatının əsas sahələri üzümçülük, tütünçülük, meyvəçilik və taxılçılıq inkişaf etmişdir. Burada həmçinin şəkər çuğunduru, xına, tərəvəz, gül becərilir. Ətlik-südlük mal-darlıq, ətlik-yunluq və südlük qoyunçuluq, baramaçılıq, arıçılıq heyvandarlığın əsas sahələridir. Yeyinti sənayesi sahəsində konserv (Ordubad, Şərur), tütün-fermentasiya, mineral su doldurulması, ət emalı, balıq zavodu (Naxçıvan, Şahbuz, Şərur) müəssisələri fəaliyyət göstərir.

Kənd təsərrüfatında alınan xammalın emalı sənayesi əsasında meyvə, tərəvəz, bostan məhsullarının konservləşdirilməsi və balıq konservləri, ət və süd emalı məhsulları, şərabçılıq, təbii meyvə və tərəvəz şirələri istehsalı, çörək və un məmulatları istehsalı, qənnadı məmulatları istehsalı, müxtəlif çeşidli bitki yağları istehsalı, sərinləşdirici içkilər istehsalı kimi yeyinti sənayesi sahələri inkişaf edir. Samuxda "NAA Aqrotara" MMC-ninmeyvə qurudulması və emalı müəssisəsi, "Gilan QəbələKonserv Zavodu" MMC-nin Qəbələ limonad zavodu, Gəncədəki "Jardin Royal" şokolad fabriki, "Cəlilabad Şərab-2" Açıq Səhmdar Cəmiyyətinin şərab zavodu, Zaqatala süd emalı zavodu, QafqazKonserv Zavodu, Azərbaycan Şəkər İstehsalat Birliyi, Zaqatala Fındıq Fabriki kimi bir çox qida məhsulları istehsal edən müəssisələr tikilib istifadəyə verilmişdir.

Xarici ölkə sərmayədarları da Azərbaycanın yeyinti sənayesinə maliyyə vəsaitinin yönəldilməsinə maraqlıdırlar. Belə bir marağın və dövlət tərəfindən yaradılmış şəraitin nəticəsində ölkəmizdə bir sıra ölkələrin şirkətlərinin yeyinti məhsulları emal edən sənaye müəssisələri tikildi. Belə ki, hazırda respublikamızda ABŞ-ın dünya miqyasında məşhur olan "Koka-Kola" şirkətinin filialı fəaliyyət göstərir. 1999-cu ildən isə "Pepsi-Kola" sularının istehsalı üzrə müəssisə açılmışdır. "Azərsun Holding" 1991-ci ildən Azərbaycanda fəaliyyətə başlamışdır. Qida istehsalı, pərakəndə satış və kənd təsərrüfatı sahəsində fəaliyyət göstərən, ölkənin qabaqcıl şirkətidir. "Azərsun Holdinq"in Azərbaycandakı ilk investisiya layihəsi olaraq 1994-cü ildə Bakıda fəaliyyətə başlamış "Sun Tea" çay fabriki bu gün məşhur çay markalarının istehsalçısıdır. Müəssisə illik ortalama 15 000 ton istehsal gücünə malik, qara çay, yaşıl çay, meyvəli çayların istehsalı ilə məşğuldur. Şirkətlər qrupunun Azərbaycanın cənubunda Lənkəran və Astarada paketləmə müəssisələri də fəaliyyət göstərir. Azərbaycanın ən seçilmiş keyfiyyətli çay yarpaqlarını emal edərək "Azərçay" markası ilə dünya bazarına təqdim edən müəssisə Azərbaycan çayının şöhrətini bütün dünyaya yayır. Şirkətlər qrupunun Şri-Lankadakı "İnter Tea" müəssisəsi broker olaraq birjalarda ən keyfiyyətli Seylon çaylarını tədarük edir. "Azərsun Holdinq" eyni zamanda dünyaca məşhur Hindistan, Vyetnam və Keniya çaylarını birbaşa çay istehsalçılarından satın alaraq, emal müəssisələrinin xammal ehtiyacını təmin edir.

2005-ci ildə AzərbaycandaPalmali Şirkətlər Qrupunun "NurSüd MMC" süd və süd məhsulları emalı zavodu təsis edilib. Artıq 2008-ci ilin əvvəlindən etibarən "PalSüd MMC" ticarət nişanı altında geniş çeşiddə süd məhsulları istehsal olunur. 2009-cu ildə "Paldad" ticarət nişanıyla məhsull buraxmağa başlayan "Palfood MMC" dondurma fabrikası təsis edilmişdir.

Azərbaycanın yeyinti sənayesi məhsulları dünya bazarına çıxarılır, beynəlxalq sərgilərdə iştirak edir. Məsələn, "Veysəloğlu" şirkətlər qrupunun tərkibinə daxil olan "Ulduz" şokolad fabriki Azərbaycanın qida sənayesində mühüm yer tutur. Fabrikin 2001-ci ildə fəaliyyətə başlaması ilə respublikada qənnadı və yeyinti sahəsinin inkişafında yeni bir inkişaf mərhələsi başlandı. Müəssisə Rusiya Federasiyası, Ukrayna, Belarus, Gürcüstan, Latviya, Qırğızıstan, Tacikistan, Yəmən, Fələstin, Birləşmiş Ərəb Əmirlikləri və digər ölkələrə Azərbaycan məhsullarını ixrac edir.

Azərbaycanın yeyinti sənayesi milli iqtisadiyyatda prioritet fəaliyyət istiqamətlərini müəyyənləşdirir və onların reallaşdırılmasının səmərəli mexaninizmini işləyib hazırlayır. Yeyinti sənayesi hesabına ölkənin ərzaq fondu formalaşdırılır və ölkədə strateji ərzaq ehtiyatı yaradılır. "Qeyri-neft sektorunun aparıcı sahələrindən biri olan aqrar sektorun inkişafı ölkə əhalisinin ərzaq təhlükəsizliyinin təmin olunması vəzifəsini daşıyır. Aqrar sektor və kənd təsərrüfatı sahələrinin qeyri-neft sektorunun potensialının artırılmasında böyük ehtiyatları vardır. " [5, s. 61]

## Nəticə

Yeyinti sənayesində strateji inkişaf və innovasiyalı inkişaf yoluna keçid əsas şərtlərdən biridir. Maliyyə vəsaitlərinin emal müəssisə və zavodlarının tikilişinə, bərpa və modernləşməsinə yönəldilməsi çox vacibdir. Elmi-tədqiqat işlərinin genişləndirilməsi, aqrar-sənaye inteqrasiyası şəraitində ixtisaslaşdırılmanın dərinləşdirilməsi və istehsalın təmərküzləşdirilməsi də kənd təsərrüfatının inkişafına əsaslanan yeyinti sənayesinin inkişafında mühüm rol oynayır. Qeyd etmək lazımdır ki, yeyinti sənayesində inkişafın təmin edilməsi üçün kənd təsərrüfatı sahələrində vergi və gömrük dərəcələrinin optimal həddi müəyyənləşdirilməli, kənd təsərrüfatı sahələri üzrə istehsalın artırılmalı və rəqabət qabiliyyətinin gücləndirilməli, regional iqtisadi əlaqələr genişləndirilməli, kənd təsərrüfatı sahələrində qabacıl texnologiyaların tətbiqi sürətlənməlidir, regionlarda sahibkarlıq fəaliyyəti üçün daha əlverişli vergi mühiti yaradılmalı, kənd təsərrüfatı və yeyinti sənayesinə cəlb olunan invenstisiyaların məbləği genişlənməli, regionlarda yerli xammala əsaslanan sənaye müəssisələrinin fəaliyyətinin keyfiyyətcə müasir səviyyədə qurulmalı və yeniləri yaradılmalı, kənd təsərrüfatı və yeyint sənayesi sahələrində yükək ixtisaslı kadrların hazırlanmasına xüsusi diqqət yetirilməli, yeyinti məhsulları bazarının formalaşdırılmasında daha sürətli nailiyyətlər əldə etmək məqsədilə istehsalçı ilə istehlakçılar arasında iqtisadi münasibətlərin tənzimlənməsi təkmilləşdirilməlidir.

Görülən tədbirlər kənd təsərrüfatı sahələrinin, qeyri-neft sektorunun davamlı və ölkə regionlarının tarazlı inkişafının təmin edilməsinə, regionlarda kommunal xidmət və sosial infrastruktur təminatının yaxşılaşdırılmasına mühüm təsir göstərməsi nəticəsində yeyinti sənayesi zamanın tələblərinə cavab verə biləcəkdir. Aqrar sektorda emalçılar ilə istehsalçılar arasında iqtisadi əlaqələrin möhkəmləndirilməsi, fermerlərin dövlətin dəstək mexanizmlərindən daha səmərəli istifadə etməsi yeyinti sənayesinin dayaqlarını daha da möhkəmlənməsinə səbəb olacaqdır.

**ƏDƏBİYYAT**

1. Aqrar sənaye üzrə arayış: Azərbaycan Respublikası İqtisadiyyat Nazirliyi, Bakı, 2015, 6 s. 2. Böyük İqtisadi Ensiklopediya. Bakı: Şərq-Qərb, 2012, 592 s. 3. Fətəliev H. K. Şərabın texnologiyası. Bakı: Elm, 2011, 581 s. 4. Pənahov T. M. , Səlimov V. S. , Zari Ə. M. Azərbaycanda üzümçülük. Bakı: Müəllim, 2010, 224 s. 5. Şəkərəliyev A. Ş. , Şəkərəliyev Q. A. Azərbaycan iqtisadiyyatı: reallıqlar və perspektivlər. Bakı: “Turxan” NPB, 2016, 536 s. 6. Əkinçilik tariximizdən Tütünçülük - Movqe. az-www. movqe. az. 7. Regional inkişaf. -www. azerbaijan. az. 8. “Azərbaycan Respublikası regionlarının 2014-2018-ci . . . - www. stat. gov. az

**Направления развития пищевой промышленности в региональном экономическом развитии**

**П. Г. Мамедов, В. А. Мурадов**

Сельское хозяйство является исходной базовой отраслью производства сельскохозяйственной продукции, сырьяи продовольствия. Развитие регионов в Азербайджане помогает взаимодействия сельскохозяйственных и перерабатывающих предприятий. Внедрение новых технологий в сельском хозяйстве, реконструкция и модернизация пищевых перерабатывающихпредприятий обеспечивают дальнейшее повышение уровняличного потребления населения страны.

***Ключевые слова:*** *регионы, экономическое развитие, сельское хозяйство, перерабатывающие предприятия, продовольственный фонд.*

**Development projects of regulatory industry in regıonal economıc development**

**P. H. Mammadov, V. A. Muradov**

Food industry plays an important role in the creation of food reserves in the country. Agriculture together with food industry take part in the economic development of regions in Azerbaijan. İmprovement of contact mechanisms between agriculture and food industry, application of new technology, reconstruction and modernization of new institutions of food industry increase personal consumption level and meet the requirements on food products.

***Key words:*** *regions, economic development, agriculture, food industry, processing enterprises, foodstuffs.*